# «İSLAMIN ƏSASLARINDAN VƏ HÖKMLƏRİN QAYDALARINDAN BƏHS EDƏN QIRX HƏDİS.»

**BÖYÜK HƏDİS ALİMİ, HAFİZ ƏN-NƏVƏVİ – Allah ona rəhmət etsin – HAFİZ İBN RƏCƏB ƏL-HƏNBƏLİNİN – Allah ona rəhmət etsin - ƏLAVƏSİ İLƏ BİRLİKDƏ.**

Arif Allahyarov

Məhərrəm ayının 10-u 1445-ci il.

## 📜 1-Cİ HƏDİS.

🕮 MÖMİNLƏRİN ƏMİRİ ÖMƏR İBN ƏL-XATTABDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEMİŞDİR: *MƏN ALLAH RƏSULUNUN* - *sallallahu aleyhi və səlləm* - *BELƏ DEDİYİNİ EŞİTDİM:* **"HƏQİQƏTƏN DƏ, (ALLAH YANINDA) ƏMƏLLƏR ANCAQ NİYYƏTLƏRƏ GÖRƏDİR. ŞÜBHƏSİZ Kİ, HƏR BİR ŞƏXSƏ ANCAQ NİYYƏTİNİN QARŞILIĞI VERİLƏR. KİMİN HİCRƏTİ ALLAHA VƏ RƏSULUNADIRSA, ONUN HİCRƏTİ ALLAHA VƏ RƏSULUNADIR. KİMİN DƏ HİCRƏTİ DÜNYƏVİ BİR MƏNFƏƏT ƏLDƏ ETMƏK ÜÇÜN VƏ YAXUD DA EVLƏNƏCƏYİ QADIN ÜÇÜNDÜRSƏ, ONUN HİCRƏTİ HƏMİN O HİCRƏT ETDİYİ ŞEYLƏR ÜÇÜNDÜR."[1]**

## 📜 2-Cİ HƏDİS.

🕮 ÖMƏR İBN ƏL-XATTABDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: BİR GÜN BİZ ALLAH RƏSULUNUN YANINDA OTURARKƏN BİZİM YANIMIZA PALTARLARININ RƏNGİ OLDUQCA AĞ, SAÇININ RƏNGİ OLDUQCA QARA, ÜZƏRİNDƏ SƏFƏRİLİK ƏLAMƏTİ GÖRÜNMƏYƏN VƏ BİZDƏN DƏ HEÇ KİMİN TANIMADIĞI BİR ŞƏXS DAXİL OLDU. (HƏMİN ŞƏXS) GƏLİB ALLAH RƏSULUNUN DÜZ QABAĞINDA ƏYLƏŞDİ, DİZLƏRİNİ

---

[1] Səhih əl-Buxari, 6689.

ALLAH RƏSULUNUN DİZLƏRİNƏ SÖYKƏDİ, ƏLLƏRİNİ DƏ ÖZ DİZLƏRİNİN ÜZƏRİNƏ QOYUB DEDİ:

📋 *EY MUHƏMMƏD! MƏNƏ İSLAM (DİNİ) HAQQINDA MƏLUMAT VER.*

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ:

**İSLAM (DİNİ)**:

1️⃣ **ALLAHDAN BAŞQA İBADƏTƏ LAYİQ HAQQ MƏBUDUN OLMAMASINA VƏ MUHƏMMƏDİN ALLAHIN RƏSULU OLDUĞUNA ŞAHİDLİK ETMƏK;**

2️⃣ **NAMAZ QILMAQ;**

3️⃣ **ZƏKAT VERMƏK;**

4️⃣ **RAMAZAN AYINDA ORUC TUTMAQ;**

5️⃣ **HƏCC ETMƏK - DEMƏKDİR.**

📋 ADAM: *DOĞRU SÖYLƏDİN* - DEDİ.

➖ ÖMƏR - Allah ondan razı olsun - DEDİ: BİZ ONA TƏƏCCÜB ETDİK. HƏM ONA (PEYĞƏMBƏRƏ) SUAL VERİR, HƏM DƏ ONUN (PEYĞƏMBƏRİN) VERDİYİ CAVABI DOĞRULAYIR.

📋 ADAM DEDİ: *MƏNƏ İMAN HAQQINDA MƏLUMAT VER.*

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ:

**İMAN**:

1️⃣ **ALLAHA İMAN GƏTİRMƏK;**

2️⃣ **ONUN MƏLƏKLƏRİNƏ İMAN GƏTİRMƏK;**

3️⃣ **ONUN KİTABLARINA İMAN GƏTİRMƏK;**

4️⃣ **ONUN PEYĞƏMBƏRLƏRİNƏ İMAN GƏTİRMƏK;**

5️⃣ **AXİRƏT GÜNÜNƏ (QİYMƏT GÜNÜNƏ) İMAN GƏTİRMƏK;**

6️⃣ **QƏDƏRİN XEYRİNƏ VƏ ŞƏRRİNƏ İMAN GƏTİRMƏK - DEMƏKDİR.**

📋 ADAM: *DOĞRU SÖYLƏDİN* - DEDİ.

📋 ADAM DEDİ: *MƏNƏ EHSAN HAQQINDA MƏLUMAT VER.*

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **EHSAN ALLAHA SANKİ ONU GÖRÜRMÜŞ KİMİ İBADƏT ETMƏYİNDİR. SƏN ONU GÖRMƏSƏN DƏ, ŞÜBHƏSİZ Kİ O, SƏNİ GÖRÜR.**

📋 ADAM DEDİ: *MƏNƏ QİYAMƏT GÜNÜ HAQQINDA XƏBƏR VER.*

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **QİYAMƏT GÜNÜ HAQQINDA SORUŞULAN (MƏN) SORUŞANDAN (SƏNDƏN) ÇOX BİLMİR.**

📋 ADAM DEDİ: *"ONDA MƏNƏ QİYAMƏTİN ƏLAMƏTLƏRİ HAQQINDA XƏBƏR VER."*

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **KÖLƏ QADININ ONA AĞALIQ EDƏCƏK QIZ UŞAĞINI DÜNYAYA GƏTİRMƏSİ, AYAQYALIN, KASIB, QOYUN OTARANLARIN GÖRKƏMLİ (HÜNDÜR) BİNALAR TİKMƏKDƏ BİR-BİRİ İLƏ YARIŞMASI.**

— ÖMƏR DEDİ: SONRA O ADAM ÇIXIB GETDİ VƏ MƏN BİR MÜDDƏT OLDUĞUM YERDƏ DAYANDIM.

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - MƏNƏ DEDİ: **EY ÖMƏR, SƏN SUAL VERƏNİN KİM OLDUĞUNU BİLİRSƏNMİ?**

━ ÖMƏR DEDİ: MƏN - ALLAH VƏ ONUN RƏSULU DAHA YAXŞI BİLİR - DEDİM.

◉ PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **HƏQİQƏTƏN DƏ, O SUAL VERƏN CƏBRAYIL İDİ. SİZƏ DİNİNİZİ ÖYRƏTMƏK ÜÇÜN GƏLMİŞDİ.**[2]

## 📜 3-CÜ HƏDİS.

🕮 ABDULLAH İBN ÖMƏRDƏN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: "**İSLAM BEŞ SÜTUN (DAYAQ) ÜZƏRİNDƏ BİNA EDİLMİŞDİR:**

1. **ALLAHDAN BAŞQA İBADƏTƏ LAYİQ HAQQ MƏBUDUN OLMAMASINA VƏ MUHAMMƏDİN - ona Allahın salavatı və salamı olsun - ONUN QULU VƏ RƏSULU OLMASINA ŞAHİDLİK ETMƏK.**
2. **NAMAZ QILMAQ.**
3. **ZƏKAT VERMƏK.**
4. **HƏCC ETMƏK.**
5. **RAMAZAN AYINDA ORUC TUTMAQ.**"[3]

---

[2] Səhih Muslim, 8.
[3] Səhih əl-Buxari, 8.

## 📜 4-CÜ HƏDİS.

🕮 ABDULLAH İBN MƏSUDDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEMİŞDİR: *DOĞRU SÖZLÜ VƏ DOĞRULUĞU TƏSDİQLƏNƏN PEYĞƏMBƏR - sallallahu aleyhi və səlləm - BİZƏ DEDİ:* **"HƏQİQƏTƏN DƏ, SİZLƏRİN HƏR BİRİNİN YARADILIŞI ANASININ BƏTNİNDƏ QIRX GÜN NÜTFƏ HALINDA BİR YERƏ TOPLANIR. SONRA BU MÜDDƏT QƏDƏR (QIRX GÜN) ALƏQA HALINDA, SONRA BU MÜDDƏT QƏDƏR DƏ MUDĞA HALINDA BİR YERƏ TOPLANIR. SONRA ONA (ALLAH TƏRƏFİNDƏN) BİR MƏLƏK GÖNDƏRİLİR. MƏLƏK ONA RUH ÜFÜRÜR VƏ ONUN ÜÇÜN DÖRD ŞEYİ YAZMAQLA ƏMR OLUNUR:**

**1 RUZİSİNİ;**

**2 ƏCƏLİNİ;**

**3 ƏMƏLİNİ;**

**4 BƏDBƏXT VƏ YA XOŞBƏXT OLACAĞINI.**

**ÖZÜNDƏN BAŞQA İBADƏTƏ LAYİQ HEÇ BİR HAQQ İLAH OLMAYAN ALLAHA AND OLSUN Kİ, SİZLƏRDƏN BİRİ CƏNNƏT ƏHLİNİN ƏMƏLİ İLƏ ƏMƏL EDƏR VƏ NƏHAYƏT ONUNLA CƏNNƏTƏ DAXİL OLMASI ARASINDA BİR QARIŞ MƏSAFƏ QALARKƏN, KİTAB ONUN ƏLEYHİNƏ İRƏLİ KEÇƏR VƏ O DA CƏHƏNNƏM ƏHLİNİN ƏMƏLİ İLƏ ƏMƏL EDİB CƏHƏNNƏMƏ DÜŞƏR. HƏMÇİNİN DƏ SİZLƏRDƏN BİRİ CƏHƏNNƏM ƏHLİNİN ƏMƏLİ İLƏ ƏMƏL EDƏR VƏ NƏHAYƏT ONUNLA**

**CƏHƏNNƏMƏ DAXİL OLMASI ARASINDA BİR QARIŞ MƏSAFƏ QALARKƏN, KİTAB ONUN XEYRİNƏ İRƏLİ KEÇƏR, O DA CƏNNƏT ƏHLİNİN ƏMƏLİ İLƏ ƏMƏL EDİB CƏNNƏTƏ DÜŞƏR.”**[4]

## 📜 5-Cİ HƏDİS.

🕮 MÖMİNLƏRİN ANASI AİŞƏDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ Allah Rəsulu - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **“KİM BİZİM BU DİNİMİZƏ ONDAN OLMAYAN BİR YENİLİK EDƏRSƏ, O ŞƏXS RƏDD OLUNUR.” (TƏRK OLUNUR)**[5]

🕮 İMAM MUSLİMİN RƏVAYƏTİNDƏ İSƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **“KİM BİZİM BUYURMADIĞIMIZ KİMİ ƏMƏL EDƏRSƏ, O ƏMƏL RƏDD OLUNUR.” (TƏRK OLUNUR)**

## 📜 6-CI HƏDİS.

🕮 NUMAN İBN BƏŞİRDƏN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“HƏQİQƏTƏN DƏ, HALALLAR DA, HARAMLAR DA AÇIQ-AYDIN BİLİNİR. AMMA BU İKİSİNİN ARASINDA İNSANLARIN BÖYÜK ƏKSƏRİYYƏTİNİN (HÖKMÜNÜ) BİLMƏDİYİ BƏZİ**

---

[4] Səhih Muslim, 2643.

[5] Səhih əl-Buxari, 2697. Səhih Muslim, 1718.

**ŞÜBHƏLİ ŞEYLƏR VARDIR. KİM BU ŞÜBHƏLİ ŞEYLƏRDƏN ÖZÜNÜ QORUYARSA, HƏM DİNİNİ, HƏM DƏ AD-SANINI QORUMUŞ OLAR. KİM DƏ BU ŞÜBHƏLİ ŞEYLƏRƏ DÜŞƏRSƏ, HARAMA DÜŞMÜŞ OLAR. QADAĞAN OLUNMUŞ ƏRAZİNİN YANINDA QOYUNLARINI OTARAN ÇOBAN KİMİ. AZ QALIB Kİ, O ÇOBAN HƏMİN O QADAĞAN OLUNMUŞ ƏRAZİYƏ GİRƏCƏK. BİLİN Kİ, HƏR BİR HÖKMDARIN QADAĞAN OLUNMUŞ ƏRAZİSİ VARDIR. ALLAHIN QADAĞAN OLUNMUŞ ƏRAZİSİ ONUN HARAMLARIDIR. İNSANIN BƏDƏNİNDƏ BİR ƏT PARÇASI VAR. ƏGƏR O, SAĞLAM OLARSA, ONDA BÜTÜN BƏDƏN ÜZVLƏRİ SAĞLAM OLAR. YOX, ƏGƏR O, XƏSTƏ OLARSA, ONDA BÜTÜN BƏDƏN ÜZVLƏRİ XƏSTƏ OLAR. BİLİN Kİ, BU ƏT PARÇASI QƏLBDİR.”**[6]

## 📜 7-Cİ HƏDİS.

🕮 TƏMİM İBN ƏVS ƏD-DƏRİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR:

 “**DİN NƏSİHƏTDİR.**”

— BİZ DEDİK: *KİMƏ NƏSİHƏTDİR?*

[6] Səhih əl-Buxari, 55. Səhih Muslim,1599.

 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“ALLAHA, ONUN KİTABINA, ONUN RƏSULUNA, MÜSƏLMANLARIN RƏHBƏRLƏRİNƏ VƏ BÜTÜN XALQA NƏSİHƏTDİR.”**[7]

## 📜 8-Cİ HƏDİS.

📖 ABDULLAH İBN ÖMƏRDƏN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“MƏN İNSANLARLA ALLAHDAN BAŞQA İBADƏTƏ LAYİQ HAQQ MƏBUDUN OLMADIĞINA VƏ MUHƏMMƏDİN ALLAHIN RƏSULU OLDUĞUNA ŞAHİDLİK EDƏNƏ QƏDƏR, NAMAZ QILIB ZƏKAT VERƏNƏ QƏDƏR VURUŞMAQLA ƏMR OLUNDUM. ƏGƏR ONLAR BUNU ETSƏLƏR, İSLAMIN HAQQI İSTİSNA OLMAQLA ÖZ MALLARINI, ÖZ CANLARINI MƏNDƏN QORUMUŞ OLARLAR. ONLARIN HAQQ-HESAB OLUNMASI ALLAHA AİDDİR.”**[8]

## 📜 9-CU HƏDİS.

📖 ƏBU-HUREYRA RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: *MƏN ALLAH RƏSULUNUN* - *ona Allahın salavatı və salamı olsun* - *BELƏ DEDİYİNİ EŞİTDİM:* **“MƏN SİZƏ NƏYİ QADAĞAN EDİRƏMSƏ, ONDAN ÇƏKİNİN VƏ NƏYİ ƏMR EDİRƏMSƏ,**

---

[7] Səhih Muslim, 55.
[8] Səhih əl-Buxari, 25.

**ONU BACARDIĞINIZ QƏDƏR YERİNƏ YETİRİN. HƏQİQƏTƏN DƏ, SİZDƏN ƏVVƏLKİLƏRİN HƏLAK OLMA SƏBƏBLƏRİ ÇOX SUAL VERMƏLƏRİ VƏ PEYĞƏMBƏRLƏRİNƏ MÜXALİF OLMALARI İDİ.”**[9]

### 📜 10-CU HƏDİS.

📖 ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“EY İNSANLAR! HƏQİQƏTƏN DƏ, ALLAH GÖZƏLDİR (NÖQSANSIZDIR) VƏ ANCAQ GÖZƏL OLANI QƏBUL EDİR. ALLAH TƏALA PEYĞƏMBƏRLƏRƏ ƏMR EDİB BUYURDUĞU ŞEYLƏRİN EYNİSİNİ MÖMİNLƏRƏ DƏ ƏMR ETMİŞDİR. UCA ALLAH BUYURUR:** ***"EY PEYĞƏMBƏRLƏR! TƏMİZ VƏ HALAL NEMƏTLƏRDƏN YEYİN VƏ YAXŞI İŞLƏR GÖRÜN."*** **(əl-Muminun surəsi, 51-ci ayə). BAŞQA BİR AYƏDƏ İSƏ UCA ALLAH DEYİR:** ***"EY İMAN GƏTİRƏNLƏR! SİZƏ VERDİYİMİZ RUZİLƏRDƏN TƏMİZ VƏ HALAL OLANINDAN YEYİN!*** **" (əl-Bəqara surəsi, 72-ci ayə).**

SONRA PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - BİR KİŞİNİ XATIRLADARAQ DEYİR: **UZUN SƏFƏR ETMİŞ, SAÇ-SAQQALI BİR-BİRİNƏ QARIŞMIŞ, ÜST-BAŞI TOZA BULAŞMIŞ HALDA ƏLLƏRİNİ SƏMAYA QALDIRIB "EY RƏBBİM! EY RƏBBİM!" DEYƏ DUA EDƏN, YEDİKLƏRİ**

---

[9] Səhih əl-Buxari, 7288.

**HARAM, İÇDİKLƏRİ HARAM, GEYİNDİKLƏRİ HARAM OLAN VƏ HARAM İLƏ BƏSLƏNƏN BU KİŞİNİN DUASI NECƏ QƏBUL OLUNSUN?!”**[10]

## 📜 11-Cİ HƏDİS.

🕮 HƏSƏN İBN ƏLİDƏN - Allah ondan və atasından razı olsun - DEMİŞDİR: *MƏN ALLAH RƏSULUNDAN* - *ona Allahın salavatı və salamı olsun* - *BU KƏLMƏLƏRİ ƏZBƏRLƏDİM:* **“SƏNİ ŞÜBHƏLƏNDİRƏN ŞEYLƏRİ TƏRK EDƏRƏK SƏNİ ŞÜBHƏLƏNDİRMƏYƏN ŞEYLƏRƏ TƏRƏF YÖNƏL.”**[11]

## 📜 12-Cİ HƏDİS.

🕮 ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“BİR MÜSƏLMANIN ONA AİD OLMAYAN İŞLƏRİ TƏRK ETMƏSİ ONUN İSLAMININ GÖZƏLLİYİNDƏNDİR.”**[12]

## 📜 13-CÜ HƏDİS.

🕮 ƏNƏS İBN MƏLİKDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU -ona Allahın salavatı və salamı olsun- DEMİŞDİR: **“SİZDƏN BİRİNİZ ÖZÜ ÜÇÜN**

---

[10] Səhih Muslim, 1015.
[11] Sunən ət-Tirmizi, 2518.
[12] Sunən ət-Tirmizi, 2317.

**İSTƏDİYİNİ QARDAŞI ÜÇÜN DƏ İSTƏMƏDİKCƏ KAMİL İMAN GƏTİRMİŞ SAYILMAZ.”**[13]

## 📜 14-CÜ HƏDİS.

🕮 ABDULLAH İBN MƏSUDDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“BU ÜÇ HAL İSTİSNA OLMAQLA MÜSƏLMAN KİŞİNİN QANINI AXITMAQ HALAL SAYILMAZ: EVLİ ZİNAKAR, QİSAS (CANIN ƏVƏZİNƏ CAN), DİNİ TƏRK EDİB CAMAATDAN AYRILAN ŞƏXS.”**[14]

## 📜 15-Cİ HƏDİS.

🕮 ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“KİM ALLAHA VƏ AXİRƏT GÜNÜNƏ İNANIRSA, YA XEYİR DANIŞSIN YA DA SUSSUN. KİM ALLAHA VƏ AXİRƏT GÜNÜNƏ İNANIRSA, QONŞUSUNA YAXŞI DAVRANSIN. KİM ALLAHA VƏ AXİRƏT GÜNÜNƏ İNANIRSA, QONAĞINA İKRAM ETSİN.”**[15]

---

[13] Səhih əl-Buxari, 13.
[14] Səhih Muslim, 1676.
[15] Səhih əl-Buxari, 6475.

## 📜 16-CI HƏDİS.

🕮 ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEMİŞDİR:

📋 BİR KİŞİ ALLAH RƏSULUNA - ona Allahın salavatı və salamı olsun - DEDİ: *EY ALLAHIN ELÇİSİ, MƏNƏ NƏSİHƏT ET.*

📃 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - ona dedi: **"QƏZƏBLƏNMƏ."**

📋 HƏMİN KİŞİ SÖZÜNÜ, İSTƏYİNİ DƏFƏLƏRLƏ TƏKRARLADI VƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - HƏR DƏFƏSİNDƏ ONA: **"QƏZƏBLƏNMƏ"** DEDİ.[16]

## 📜 17-Cİ HƏDİS.

🕮 ŞƏDSƏD İBN ƏVSDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **"ŞÜBHƏSİZ Kİ, ALLAH HƏR BİR ŞEYDƏ YAXŞILIĞI ƏMR EDİR. ÖLDÜRƏN ZAMAN GÖZƏL ŞƏKİLDƏ ÖLDÜRÜN. HEYVANI KƏSƏN ZAMAN GÖZƏL ŞƏKİLDƏ KƏSİN. SİZDƏN HEYVAN KƏSƏN ŞƏXS BIÇAĞININ AĞZINI YAXŞICA İTİLƏSİN VƏ KƏSƏCƏYİ HEYVANI RAHATLAŞDIRSIN."**[17]

---

[16] Səhih əl-Buxari, 6116.
[17] Səhih Muslim, 1955.

## 📜 18-Cİ HƏDİS.

🕮 ƏBU-ZƏRDƏN VƏ MUAZ İBN CƏBƏLDƏN - Allah onlardan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun- DEMİŞDİR: **“HARADA OLURSANSA OL, ALLAHDAN QORX. BİR PİS ƏMƏL EDƏN ZAMAN ARDINCA YAXŞI BİR ƏMƏL ET Kİ, ONU SİLSİN. İNSANLARLA GÖZƏL ƏXLAQ İLƏ RƏFTAR ET.”**[18]

## 📜 19-CU HƏDİS.

🕮 ABDULLAH İBN ABBASDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: *BİR GÜN MƏN ALLAH RƏSULUNUN - ona Allahın salavatı və salamı olsun - ARXASINDA İDİM. O MƏNƏ DEDİ:* **“EY OĞUL! MƏN SƏNƏ KƏLMƏLƏR ÖYRƏDƏCƏYƏM. ALLAHI QORU, ALLAH DA SƏNİ QORUSUN. ALLAHI QORU Kİ, ONU QARŞINDA TAPASAN. İSTƏDİKDƏ ALLAHDAN İSTƏ. KÖMƏKLİK İSTƏDİKDƏ ALLAHDAN KÖMƏKLİK İSTƏ. BİL Kİ, ƏGƏR İNSANLARIN HAMISI SƏNƏ XEYİR VERMƏK ÜÇÜN BİR YERƏ TOPLANSALAR, ALLAHIN YAZDIĞINDAN ARTIQ XEYİR VERƏ BİLMƏZLƏR. BİL Kİ, İNSANLARIN HAMISI SƏNƏ ZƏRƏR VERMƏK ÜÇÜN BİR YERƏ TOPLANSALAR ALLAHIN YAZDIĞINDAN ARTIQ ZƏRƏR VERƏ**

[18] Sunən ət-Tirmizi, 1987.

**BİLMƏZLƏR. (ONA GÖRƏ Kİ) QƏLƏMLƏR QALDIRILMIŞ, SƏHİFƏLƏR İSƏ QURUDULMUŞDUR.”**

🕮 BAŞQA BİR RƏVAYƏTDƏ İSƏ ALLAH RƏSULU- ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“ALLAHI QORU Kİ, ONU ÖNÜNDƏ TAPASAN. FİRAVAN VƏ ƏMİN-AMANLIQ VAXTINDA ALLAHI YADA SAL Kİ, ALLAH DA SƏNİ ÇƏTİN VƏ SIXINTILI VAXTINDA YADA SALSIN. BİL Kİ, SƏNDƏN YAN KEÇƏN (BƏLA, İMTAHAN) SƏNƏ TOXUNMAMALI İDİ, BAŞINA GƏLƏN İSƏ SƏNDƏN YAN KEÇMƏMƏLİ İDİ. BİL Kİ, ALLAHIN YARDIMI SƏBİRİN ARDINCA GƏLİR. RAHATLIQ KƏDƏR VƏ SIXINTININ ARDINCA GƏLİR VƏ HƏQİQƏTƏN DƏ, HƏR BİR ÇƏTİNLİKDƏN SONRA ASANLIQ GƏLİR.”[19]**

## 📜 20-Cİ HƏDİS.

🕮 UQBƏ İBN AMİRDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU -ona Allah salavatı və salamı olsun- DEMİŞDİR: **“HƏQİQƏTƏN DƏ, İNSANLARIN PEYĞƏMBƏRLİK KƏLAMLARINDAN BAŞA DÜŞÜB DƏRK ETDİKLƏRİ İLK ŞEY: "ƏGƏR UTANMIRSANSA, İSTƏDİYİNİ ET!”[20]**

---

[19] Sunən ət-Tirmizi, 2516.

[20] Səhih əl-Buxari, 6120.

## 📜 21-Cİ HƏDİS.

🕮 SUFYAN İBN ABDULLAHDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: *MƏN DEDİM: EY ALLAHIN RƏSULU! MƏNƏ İSLAM DİNİ HAQQINDA ELƏ BİR SÖZ SÖYLƏ Kİ, O HAQDA SƏNDƏN SAVAYI HEÇ KİMDƏN SORUŞMAYIM.*

📃 PEYĞƏMBƏR -ona Allahın salavatı və salamı olsun- DEDİ: **“ALLAHA İMAN GƏTİRDİM" DE, SONRA DOĞRU YOL TUT."”**[21]

## 📜 22-Cİ HƏDİS.

🕮 CABİR İBN ABDULLAH - Allah ondan və atasından razı olsun - RƏVAYƏT EDİR Kİ, BİR KİŞİ PEYĞƏMBƏRƏ -ona Allahın salavatı və salamı olsun- DEDİ: *EY ALLAHIN ELÇİSİ! SƏN NECƏ BAXIRSAN? ƏGƏR MƏN FƏRZ NAMAZLARINI QILSAM, RAMAZAN AYINDA ORUC TUTSAM, HALALLARI HALAL, HARAMLARI DA HARAM GÖRSƏM, BUNLARA RİAYƏT EDİB VƏ BUNLARIN ÜZƏRİNƏ HEÇ BİR ŞEY ƏLAVƏ ETMƏSƏM, CƏNNƏTƏ GİRƏ BİLƏRƏM?*

📃 PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“BƏLİ!”**[22]

▪ *"HARAMI HARAM GÖRSƏM"* SÖZÜNÜN MƏNASI, YƏNİ: "ONLARDAN ÇƏKİNSƏM" DEMƏKDİR.

---

[21] Səhih Muslim, 38.
[22] Səhih Muslim, 15.

▪ *"HALALI HALAL GÖRSƏM"* SÖZÜNÜN MƏNASI İSƏ "ONU EDƏRKƏN HALALLIĞINA ETİQAD EDƏRƏK" ETMƏKDİR.

## 📜 23-CÜ HƏDİS.

🕮 HARİS İBN ASİM ƏL-ƏŞARİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU -ona Allahın salavatı və salamı olsun- DEMİŞDİR: “**TƏMİZLİK (DƏSTƏMAZ) İMANIN (NAMAZIN) YARISIDIR. "ƏLHƏMDULİLLƏH" (ZİKRİ) TƏRƏZİNİ DOLDURUR. "SUBHƏNALLAHİ VƏL-HƏMDULİLLƏH" (ZİKRİ) İSƏ GÖY İLƏ YERİN ARASINI DOLDURUR. NAMAZ BİR NURDUR, SƏDƏQƏ VERMƏK BİR SÜBUTDUR, SƏBİRLİ OLMAQ BİR İŞIQDIR. QURAN SƏNİN YA LEHİNƏ (XEYRİNƏ), YA DA ƏLEYHİNƏ (ZİYANINA) BİR DƏLİLDİR. BÜTÜN İNSANLAR SƏHƏR ERKƏNDƏN YOLA ÇIXIRLAR. KİMİSİ ÖZ NƏFSİNİ SATIN ALIB XİLAS EDİR, KİMİSİ DƏ ÖZ NƏFSİNİ SATIN ALIB ONU HƏLAKA APARIR.”**[23]

## 📜 24-CÜ HƏDİS.

🕮 ƏBU-ZƏRR ƏL-ĞİFARİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH NƏBİSİ - ona Allahın salavatı və salamı olsun - İZZƏT VƏ CƏLAL SAHİBİ OLAN UCA ALLAHIN BELƏ DEDİYİNİ RƏVAYƏT ETMİŞDİR: **“EY**

---

[23] Səhih Muslim, 223.

**MƏNİM QULLARIM! HƏQİQƏTƏN DƏ, MƏN ZÜLM ETMƏYİ ÖZ NƏFSİMƏ HARAM ETDİM VƏ ONU SİZİN ARANIZDA DA HARAM ETDİM. BİR-BİRİNİZƏ ZÜLM ETMƏYİN.”**

**“EY MƏNİM QULLARIM! MƏNİM HİDAYƏT VERDİYİM ŞƏXSDƏN BAŞQA SİZİN HAMINIZ ZƏLALƏT İÇƏRİSİNDƏSİNİZ. MƏNDƏN HİDAYƏT İSTƏYİN, MƏN DƏ SİZİ DOĞRU YOLA YÖNƏLDİM.”**

**“EY MƏNİM QULLARIM! MƏNİM YEDİRTDİYİM ŞƏXSLƏRDƏN BAŞQA SİZİN HAMINIZ ACSINIZ. MƏNDƏN SİZİ YEDİRTMƏYİMİ İSTƏYİN, MƏNDƏ SİZİ YEDİZDİRİM.”**

**“EY MƏNİM QULLARIM! MƏNİM GEYİNDİRDİKLƏRİMDƏN BAŞQA SİZİN HAMINIZ PALTARSIZSINIZ. MƏNDƏN SİZİ GEYİNDİRMƏYİMİ İSTƏYİN, MƏN DƏ SİZ GEYİNDİRİM.”**

**“EY MƏNİM QULLARIM! HƏQİQƏTƏN DƏ, SİZ GECƏ VƏ GÜNDÜZ GÜNAH EDİRSİNİZ VƏ MƏN BÜTÜN GÜNAHLARI BAĞIŞLAYANAM. MƏNDƏN BAĞIŞLANMA İSTƏYİN, MƏN DƏ SİZİ BAĞIŞLAYIM.”**

**“EY MƏNİM QULLARIM! MƏNƏ ZƏRƏR VERMƏK SİZİN ƏLİNİZDƏN GƏLMƏZ Kİ, MƏNƏ ZƏRƏR VERƏSİNİZ VƏ MƏNƏ FAYDA VERMƏYƏ GÜCÜNÜZ ÇATMAZ Kİ, MƏNƏ FAYDA VERƏSİNİZ.”**

**“EY MƏNİM QULLARIM! HƏQİQƏTƏN DƏ, ƏGƏR SİZİN ƏVVƏLKİLƏRİNİZ VƏ AXIRINCILARINIZ, İNSANLARIN VƏ CİNLƏRİN QƏLBLƏRİ İÇƏRİNİZDƏN ƏN TƏQVALI İNSANIN QƏLBİ KİMİ OLSA DA BELƏ, BU MƏNİM MÜLKÜMDƏ HEÇ BİR ŞEY ARTIRMAZ.”**

**“EY MƏNİM QULLARIM! HƏQİQƏTƏN DƏ, ƏGƏR SİZİN ƏVVƏLKİLƏRİNİZ VƏ AXIRINCILARINIZ, İNSANLARIN VƏ CİNLƏRİN QƏLBLƏRİ İÇƏRİNİZDƏN ƏN GÜNAHKAR İNSANIN QƏLBİ KİMİ OLSA BELƏ, BU MƏNİM MÜLKÜMDƏN HEÇ BİR ŞEY ƏSKİLTMƏZ.”**

**“EY MƏNİM QULLARIM! HƏQİQƏTƏN DƏ, ƏGƏR SİZİN ƏVVƏLKİLƏRİNİZ VƏ AXIRINCILARINIZ, İNSANLAR VƏ CİNLƏR DÜZƏNLİK BİR ƏRAZİDƏ AYAQ ÜSTƏ TOPLANIB MƏNƏ DUA EDİB MƏNDƏN İSTƏSƏLƏR, MƏN DƏ HƏR BİR İNSANIN İSTƏDİYİNİ ONA VERSƏM, BU MƏNİM MÜLKÜMDƏN ANCAQ VƏ ANCAQ İYNƏNİN DƏNİZƏ SALINDIĞI ZAMAN DƏNİZDƏN ƏSKİLTDİYİ QƏDƏR ƏSKİLDƏR.”**

**“EY MƏNİM QULLARIM! BUNLAR SİZİN ƏMƏLLƏRİNİZDİR. ONLARI SİZİN ÜÇÜN SAYIRAM, SONRA ONLARI SİZƏ ƏSKİKSİZ VERƏCƏYƏM. BUNDAN SONRA KİM XEYİR TAPARSA, ALLAHA HƏMD ETSİN. KİM DƏ XEYİRDƏN BAŞQA BİR ŞEYLƏ QARŞILAŞARSA, ÖZÜNDƏN BAŞQA HEÇ KİMİ QINAMASIN.”[24]**

[24] Səhih Muslim, 2577.

## 📜 25-Cİ HƏDİS.

📖 ƏBU ZƏRR ƏL-ĞİFARİDƏN -Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, BƏZİ İNSANLAR ALLAH RƏSULUNA - ona Allahın salavatı və salamı olsun - DEDİLƏR: *EY ALLAHIN ELÇİSİ! VARLILAR SAVABLARI GÖTÜRÜB GETDİLƏR. ONLAR DA BİZİM NAMAZ QILDIĞIMIZ KİMİ NAMAZ QILIR, ORUC TUTDUĞUMUZ KİMİ ORUC TUTUR, MALLARININ ƏN YAXŞISINDAN (ALLAH YOLUNDA) SƏDƏQƏ VERİRLƏR.*

📱 ALLAH RƏSULU -ona Allahın salavatı və salamı olsun- DEDİ: **“MƏGƏR ALLAH SİZİN ÜÇÜN SƏDƏQƏ OLARAQ ƏMƏLLƏR YARATMAYIBMI?! HƏQİQƏTƏN DƏ, HƏR BİR “SUBHƏNALLAH” SÖZÜNÜN MÜKAFATI SƏDƏQƏDİR, HƏR BİR “ALLAHU ƏKBƏR” SÖZÜNÜN MÜKAFATI SƏDƏQƏDİR, HƏR BİR “ƏLHƏMDULİLLƏH” SÖZÜNÜN MÜKAFATI SƏDƏQƏDİR, HƏR BİR “LƏƏ İLƏHƏ İLLƏLLAH” SÖZÜNÜN MÜKAFATI SƏDƏQƏDİR, YAXŞILIĞI ƏMR ETMƏYİN MÜKAFATI SƏDƏQƏDİR, PİSLİKLƏRDƏN ÇƏKİNDİRMƏYİN MÜKAFATI SƏDƏQƏDİR. HƏTTA SİZDƏN BİRİNİZİN ÖZ HƏYAT YOLDAŞI İLƏ YAXINLIQ ETMƏSİNİN MÜKAFATI SƏDƏQƏDİR.”**

📃 SƏHABƏLƏR DEDİLƏR: *EY ALLAHIN RƏSULU! BİZDƏN HƏR HANSI BİR ŞƏXSƏ ŞƏHVANİ İSTƏK VƏ ARZU GƏLİR,*

*MƏGƏR BU İSTƏYİ QARŞILAMAQDA ONUN ÜÇÜN MÜKAFAT VAR?!*

ALLAH RƏSULU -ona Allahın salavatı və salamı olsun- DEDİ: **"MƏNƏ BİR DEYİN GÖRÜM, ƏGƏR O BU İSTƏYİNİ HARAM YOLLA QARŞILASAYDI, BUNA GÖRƏ O GÜNAH QAZANMAZDIMI? ELƏCƏ DƏ, HALAL YOLLA QARŞILAYAN ZAMAN MÜKAFAT QAZANMIŞ OLUR."**[25]

## 26-CI HƏDİS.

ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - Ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **"İNSANLARIN BƏDƏNİNDƏKİ HƏR BİR OYNAĞI ÜÇÜN GÜNƏŞİN DOĞDUĞU HƏR BİR GÜNDƏ SƏDƏQƏ VARDIR. İKİ NƏFƏRİN ARASINDA ƏDALƏTLƏ HÖKM VERMƏK SƏDƏQƏDİR. BİR İNSANA MİNİYİNƏ MİNMƏK ÜÇÜN KÖMƏKLİK ETMƏK VƏ YAXUD DA ƏŞYALARINI MİNİYƏ YÜKLƏMƏK ÜÇÜN KÖMƏKLİK ETMƏK SƏDƏQƏDİR. GÖZƏL SÖZ SÖYLƏMƏK SƏDƏQƏDİR. NAMAZ QILMAQ ÜÇÜN MƏSCİDƏ GEDƏRKƏN ADDIMLADIĞIN HƏR BİR ADDIM SƏDƏQƏDİR. YOLDA ƏZİYYƏT VERƏN BİR ŞEYİ GÖTÜRÜB YOLDAN KƏNARA QOYMAQ SƏDƏQƏDİR."**[26]

---

[25] Səhih Muslim, 1006.
[26] Səhih əl-Buxari, 2989. Səhih Muslim, 1009.

## 📜 27-Cİ HƏDİS.

🕮 NƏVVAS İBN SƏNANDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH NƏBİSİ - Ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **"YAXŞI ƏMƏL GÖZƏL ƏXLAQDIR (YAXŞI ƏMƏL GÖZƏL ƏXLAQLI OLMAQDIR). GÜNAH İSƏ SƏNİN QƏLBİNİ NARAHAT EDƏN VƏ İNSANLARIN XƏBƏRDAR OLMALARINI (BİLMƏLƏRİNİ) İSTƏMƏDİYİN ŞEYDİR."**[27]

🕮 VƏBİSƏ İBN MƏBƏDDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: MƏN ALLAH RƏSULUNUN - ona Allahın salavatı və salamı olsun- YANINA GƏLDİM, O - sallallahu aleyhi və səlləm - MƏNƏ DEDİ: **"SƏN YAXŞI ƏMƏL VƏ PİS ƏMƏL HAQQINDA SORUŞMAĞA GƏLMİSƏN?**"

📃 MƏN DEDİM: *BƏLİ, EY ALLAHIN RƏSULU.*

📱 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: "**SƏN BU HAQDA QƏLBİNDƏN SORUŞ, ONDAN CAVAB İSTƏ. YAXŞI ƏMƏL İNSANIN NƏFSİNİN ARXAYINLIQ TAPDIĞI VƏ QƏLBİNİN RAHAT OLDUĞU ƏMƏLDİR. GÜNAH ƏMƏL İSƏ İNSANLAR SƏNƏ FƏTVA VERSƏLƏR DƏ, QƏLBİNDƏ NARAHAT OLDUĞUN VƏ SƏNİN DƏ TƏRƏDDÜD ETDİYİN ƏMƏLDİR."**[28]

[27] Səhih əl-Buxari, 2553.
[28] İmam Əhməd, Musnəd,4/227.

## 📜 28-Cİ HƏDİS.

🕮 İRBAD İBN SƏRİYƏDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: *BİR GÜN ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - BİZƏ ÖYÜD-NƏSİHƏT ETDİ. ÖZÜDƏ ELƏ BİR ÖYÜD NƏSİHƏT ETDİ Kİ, BUNDAN QƏLBLƏR QORXUYA DÜŞDÜ, GÖZLƏR İSƏ YAŞLA DOLDU. BİZ DEDİK: EY ALLAHIN RƏSULU! BU NƏSİHƏT, SANKİ VİDALAŞIB GEDƏN İNSANIN NƏSİHƏTİDİR. BİZƏ TÖVSİYƏ VER.*

ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **"MƏN SİZƏ ALLAHDAN QORXMAĞI VƏ ÜSTÜNÜZƏ BİR KÖLƏ BELƏ ƏMR SAHİBİ SEÇİLSƏ, ONU EŞİDİB, ONA TABE OLMAĞI TÖVSİYƏ EDİRƏM. HƏQİQƏTƏN DƏ, SİZLƏRDƏN MƏNDƏN SONRA YAŞAYACAQ OLANLAR ÇOXLU İXTİLAFLAR GÖRƏCƏKLƏR. SİZƏ (BU İXTİLAFLAR ZAMANI) MƏNİM SÜNNƏM VƏ DOĞRU YOLDA OLAN RAŞİDİ XƏLİFƏLƏRİN SÜNNƏSİ İLƏ GETMƏYİ TÖVSİYƏ EDİRƏM. ONDAN AZI DİŞLƏRİNİZLƏ MÖHKƏM YAPIŞIN. QƏTİYYƏN DİNƏ YENİLİK GƏTİRMƏYİN. HƏQİQƏTƏN DƏ, HƏR BİR BİDƏT ZƏLALƏTDİR."[29]**

[29] Sunən əbu-Davud, 4607.

## 📜 29-CU HƏDİS.

🕮 MUAZ İBN CƏBƏLDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: MƏN DEDİM: *EY ALLAHIN RƏSULU! MƏNƏ MƏNİ CƏNNƏTƏ DAXİL EDƏCƏK VƏ CƏHƏNNƏMDƏN UZAQLAŞDIRACAQ ƏMƏL HAQQINDA XƏBƏR VER.*

📱 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **"SƏN ÇOX ƏZƏMƏTLİ BİR ŞEY HAQQINDA SORUŞDUN. BUNUNLA BELƏ, O, ALLAHIN ASANLAŞDIRDIĞI KİMSƏ ÜÇÜN ÇOX ASANDIR. ALLAHA İBADƏT ET VƏ ONA HEÇ BİR ŞEYİ ŞƏRİK QOŞMA, NAMAZ QIL, ZƏKAT VER, RAMAZAN AYINDA ORUC TUT VƏ HƏCC ET."**

📱 SONRA PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **"SƏNƏ XEYİR QAPILARINI GÖSTƏRİMMİ? ORUC BİR QALXANDIR, SƏDƏQƏ GÜNAHLARI SUYUN ODU SÖNDÜRDÜYÜ KİMİ SÖNDÜRÜR (BAĞIŞLADIR). BİR DƏ İNSANIN GECƏ YARISI QILDIĞI NAMAZ."**

📱 SONRA ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - BU AYƏNİ OXUDU: ***"ONLAR GECƏ NAMAZINI QILMAQ ÜÇÜN QORXU VƏ ÜMİD İÇƏRİSİNDƏ ÖZ RƏBBİNƏ YALVARIB VƏ ONLARA VERDİYİMİZ RUZİLƏRDƏN ALLAH YOLUNDA XƏRCLƏYİRLƏR. ETDİKLƏRİ ƏMƏLLƏRİN MÜKAFATI KİMİ ONLAR ÜÇÜN GÖZLƏRİNƏ SEVİNC***

***GƏTİRƏCƏK NƏLƏR SAXLANDIĞINI HEÇ KƏS BİLMİR.”***

(Səcdə surəsi, 16,17 ayələr)

SONRA PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“SƏNƏ BU İŞİN BAŞINI, ONUN DİRƏYİNİ VƏ ƏN UCA ZİRVƏSİNİ XƏBƏR VERİMMİ?”**

MƏN DEDİM: *ƏLBƏTTƏ, EY ALLAHIN RƏSULU.*

PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“BU İŞİN BAŞI İSLAM, DİRƏYİ NAMAZ, ƏN UCA ZİRVƏSİ İSƏ CİHADDIR.”**

SONRA PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“SƏNƏ BUNLARIN HAMISINA NƏ İLƏ NAİL OLUNACAĞINI XƏBƏR VERİMMİ?”**

MƏN DEDİM: *ƏLBƏTTƏ, EY ALLAHIN RƏSULU.*

BU ZAMAN ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - ƏLİ İLƏ DİLİNİ TUTUB DEDİ: **“BUNA SAHİB OL.”**

MƏN DEDİM: EY ALLAHIN NƏBİSİ! MƏGƏR BİZ *DANIŞDIĞIMIZ SÖZLƏRƏ GÖRƏ SORĞU-SUAL OLUNACAĞIQ?!*

PEYĞƏMBƏR - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“ANAN SƏNİ İTİRMƏKLƏ AĞIRLIQ (İMTAHAN) KEÇİRSİN, EY MUAZ! İNSANLARIN ÜZÜ ÜSTƏ VƏ YA BURUNLARI ÜSTƏ SÜRÜNƏ-SÜRÜNƏ CƏHƏNNƏMƏ DAXİL OLMALARINA SƏBƏB DİLLƏRİNDƏN ÇIXAN**

**SÖZLƏR DEYİLMİ?”[30] (DİLLƏRİNİN MƏHSULU DEYİLMİ?)**

## 📜 30-CU HƏDİS.

🕮 CURSUM İBN NƏSİRDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“HƏQİQƏTƏN DƏ, UCA ALLAH FƏRZLƏR TƏYİN ETMİŞDİR, ONLARA QARŞI LAQEYD OLMAYIN, HÜDUDLAR QOYMUŞDUR, ONLARI AŞMAYIN, BƏZİ ŞEYLƏRİ İSƏ HARAM EDİB, O HARAMLARI XƏFİFƏ ALIB ONLARA DÜŞMƏYİN. BƏZİ ŞEYLƏR BARƏSİNDƏ İSƏ UNUTDUĞUNDAN DEYİL, SİZƏ OLAN RƏHMƏTİNDƏN SUSMUŞDUR, ONLARI ARAYIB ARAŞDIRMAYIN.”[31]**

## 📜 31-Cİ HƏDİS.

🕮 SƏHL İBN SƏİDİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ BİR KİŞİ ALLAH RƏSULUNUN - ona Allahın salavatı və salamı olsun - YANINA GƏLİB DEDİ: *EY ALLAHIN RƏSULU, MƏNİ ELƏ BİR ƏMƏLƏ YÖNƏLT Kİ, MƏN ONU EDƏN ZAMAN ALLAH DA MƏNİ SEVSİN, İNSANLAR DA MƏNİ SEVSİN.*

---

[30] Sunən ət-Tirmizi, 2616.
[31] Sunən əd-Dəraqutni, 4/184.

ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“DÜNYANI TƏRK ET, ONA RƏĞBƏT BƏSLƏMƏ, ALLAH SƏNİ SEVƏCƏK. İNSANLARIN ƏLİNDƏ OLANDAN GÖZÜNÜ ÇƏK, ONA TAMAH SALMA, İNSANLAR SƏNİ SEVƏCƏK.”**[32]

## 32-Cİ HƏDİS.

ƏBU-SƏİD ƏL-XURDİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“ZƏRƏR VURMAQ YOXDUR VƏ ZƏRƏRƏ ZƏRƏRLƏ QARŞILIQ VERMƏK DƏ YOXDUR.”**[33]

## 33-CÜ HƏDİS.

ABDULLAH İBN ABBASDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“ƏGƏR İNSANLARA İDDİALARINA GÖRƏ VERİLSƏYDİ, ONDA BİR QİSİM İNSAN (BÜTÖV) BİR QÖVMÜN MALLARININ VƏ CANLARININ ÜZƏRİNDƏ HAQLARININ OLDUĞUNU İDDİA EDƏRDİLƏR. LAKİN HAL BELƏ DEYİL. İDDİA EDƏN DƏLİL VƏ SÜBUT GƏTİRMƏLİDİR, İNKAR EDƏN İSƏ AND İÇMƏLİDİR.”**[34]

---

[32] Sunən ibn Məcə, 4102.
[33] Sunən ibn Məcə, 2341.
[34] Sunən əl-Beyhaqi,10/252.

## 📜 34-CÜ HƏDİS.

📖 ƏBU SƏİD ƏL-XUDRİDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **“SİZDƏN BİRİNİZ GÜNAH BİR ƏMƏLLƏ QARŞILAŞDIĞI ZAMAN ONU ƏLİ İLƏ DÜZƏLTSİN. ƏGƏR BACARMAZSA, ONDA DİLİ İLƏ İNKAR ETSİN. ƏGƏR DİLİ İLƏ İNKAR EDƏ BİLMİRSƏ, ONDA QƏLBİ İLƏ İNKAR ETSİN. BU, İMANIN ƏN ZƏİF HALIDIR.”**[35]

## 📜 35-Cİ HƏDİS.

📖 ƏBU HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **“BİR-BİRİNİZƏ PAXILLIQ ETMƏYİN. MALI SATMAQ ÜÇÜN BİR-BİRİNİZİ ALDATMAYIN. BİR-BİRİNİZƏ NİFRƏT ETMƏYİN. BİR-BİRİNİZƏ ARXA (ÜZ ÇEVİRMƏYİN) ÇEVİRMƏYİN. BİRİNİZ DİGƏR QARDAŞININ TİCARƏTİNİN ÜZƏRİNƏ TİCARƏT ETMƏSİN. EY ALLAHIN QULLARI, QARDAŞ OLUN. MÜSƏLMAN MÜSƏLMANIN QARDAŞIDIR. ONA ZÜLM ETMƏZ, ONU KÖMƏKSİZ, BAŞLI-BAŞINA QOYMAZ VƏ ONU TƏHQİR EDİB ALÇALTMAZ. TƏQVA BURADADIR" - DEYƏRƏK ƏLİ İLƏ ÜÇ DƏFƏ SİNƏSİNƏ İŞARƏ ETDİ.**

---

[35] Səhih Muslim, 49..

**"KİŞİYƏ ÖZ MÜSƏLMAN QARDAŞINI TƏHQİR EDİB ALÇALTMASI GÜNAH OLARAQ KİFAYƏTDİR. HƏR BİR MÜSƏLMANIN QANI, MALI VƏ NAMUSU DİGƏR MÜSƏLMANA HARAMDIR."**[36]

## 📜 36-CI HƏDİS.

🕮 ƏBU HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **"KİM BİR MÖMİNİN DÜNYƏVİ SIXINTILARINDAN BİRİNİ QARŞILAYARSA, ALLAH DA ONUN QİYAMƏT GÜNÜ SIXINTILARINDAN BİRİNİ QARŞILAYAR. KİM ÇƏTİNƏ DÜŞƏNİ ÇƏTİNLİKDƏN XİLAS EDƏRSƏ, ALLAH DA ONU DÜNYADA VƏ AXİRƏTDƏ XİLAS EDƏR. KİM BİR MÜSƏLMANIN XƏTASINI ÖRTƏRSƏ, ALLAH DA DÜNYA VƏ AXİRƏTDƏ ONUN XƏTASINI ÖRTƏR. BƏNDƏ ÖZ QARDAŞINA KÖMƏK ETDİYİ MÜDDƏTCƏ ALLAH DA ONA KÖMƏK EDƏR. KİM ELM ÖYRƏNMƏK ÜÇÜN YOLA ÇIXARSA, ALLAH ONUN CƏNNƏTƏ GEDƏN YOLUNU ASANLAŞDIRAR. BİR CAMAAT ALLAHIN KİTABINI OXUMAQ VƏ ÖZ ARALARINDA QARŞILIQLI MÜZAKİRƏ ETMƏK ÜÇÜN ALLAHIN EVLƏRİNDƏN BİRİN DƏ TOPLANARSA, ONLARIN ÜZƏRİNƏ SAKİTLİK NAZİL OLAR, ALLAHIN RƏHMƏTİ ONALARI BÜRÜYƏR,**

[36] Səhih Muslim, 2564.

**MƏLƏKLƏR ONLARI ƏHATƏYƏ ALAR VƏ ALLAH DA ONLARI ÖZ YANINDAKILARIN YANINDA YAD EDƏR. KİMİN ƏMƏLİ ONUN GECİKMƏSİNƏ SƏBƏB OLARSA, QOHUMLARI (YAXINLARI) ONU SÜRƏTLƏNDİRMƏZ.”**[37]

## 📜 37-Cİ HƏDİS.

🕮 ABDULLAH İBN ABBASDAN - Allah ondan və atasında razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - sallallahu aleyhi və səlləm - DEMİŞDİR: **“HƏQİQƏTƏN DƏ, ALLAH TƏALA BÜTÜN YAXŞI ƏMƏLLƏRİ VƏ PİS ƏMƏLLƏRİ YAZMIŞ VƏ SONRA BUNU AÇIQLAMIŞDIR: KİM BİR YAXŞI İŞ GÖRMƏYƏ NİYYƏT EDİB QƏRAR VERƏR, LAKİN ONU EDƏ BİLMƏZSƏ, ALLAH TƏALA ONU ÖZ YANINDA EDİLMİŞ TAM BİR YAXŞI ƏMƏL OLARAQ YAZAR. KİM DƏ BİR YAXŞI İŞ GÖRMƏYƏ NİYYƏT EDİB QƏRAR VERƏR VƏ ONU EDƏRSƏ, ALLAH TƏALA O YAXŞI ƏMƏLİN SAVABINI ÖZ YANINDA ON HƏSƏNƏTDƏN YEDDİ YÜZ HƏSƏNƏTƏ QƏDƏR, HƏTTA QAT-QAT ARTIQLAMASI İLƏ YAZAR. KİM BİR PİS İŞ GÖRMƏYƏ NİYYƏT EDİB QƏRAR VERƏR, LAKİN ONU ETMƏZSƏ, ALLAH TƏALA ONU ÖZ YANINDA EDİLMİŞ TAM BİR YAXŞI ƏMƏL OLARAQ YAZAR. KİM DƏ BİR PİS**

---

[37] Səhih Muslim, 2699.

**İŞ GÖRMƏYƏ NİYYƏT EDİB QƏRAR VERƏR VƏ ONU EDƏRSƏ, ALLAH TƏALA ONA BİR GÜNAH YAZAR.”**[38]

## 📜 38-Cİ HƏDİS.

🕮 ƏBU-HUREYRADAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“UCA ALLAH DEYİR: KİM MƏNİM BƏNDƏMLƏ DÜŞMƏNÇİLİK EDƏRSƏ, MƏN ONA QARŞI MÜHARİBƏ ELAN EDƏRƏM. QULUM MƏNƏ ONA FƏRZ ETDİYİM ƏMƏLLƏRİ YERİNƏ YETİRMƏKDƏN DAHA SEVİMLİ BİR ƏMƏLLƏ YAXINLAŞMAMIŞDIR. QULUM MƏNƏ NAFİLƏ İBADƏTLƏRLƏ YAXINLAŞMAĞA DAVAM ETDİYİ MÜDDƏTCƏ MƏN ONU SEVƏRƏM. MƏN QULUMU SEVSƏM, ARTIQ ONUN EŞİDƏN QULAĞI, GÖRƏN GÖZÜ, TUTAN ƏLİ VƏ YERİYƏN AYAĞI OLARAM. ƏGƏR MƏNDƏN BİR ŞEY İSTƏSƏ, İSTƏDİYİNİ ONA VERƏRƏM. MƏNDƏN SIĞINACAQ İSTƏSƏ, MƏN ONU SIĞINACAĞIMA ALARAM.”**[39]

## 📜 39-CU HƏDİS.

🕮 ABDULLAH İBN ABBASDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“UCA ALLAH**

---

[38] Səhih əl-Buxari, 6491. Səhih Muslim, 131.
[39] Səhih əl-Buxari, 6502.

**MƏNİM ÜMMƏTİMİN SƏHVƏN, UNUTQANLIQDAN VƏ YA MƏCBURİYYƏT QARŞISINDA QALARAQ ETDİYİ GÜNAHLARINI BAĞIŞLAMIŞDIR.”**[40]

## 📜 40-CI HƏDİS.

🕮 ABDULLAH İBN ÖMƏRDƏN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEMƏKDİR: *ALLAH RƏSULU* - *ona Allahın salavatı və salamı olsun* - *ƏLİNİ MƏNİM ÇİYNİMƏ QOYUB DEDİ:* **“BU DÜNYADA QÜRBƏT ELDƏ YAŞAYAN BİRİ KİMİ YA DA KEÇİB GEDƏN BİR YOLÇU KİMİ YAŞA.”**

🕮 ABDULLAH İBN ÖMƏR - Allah ondan və atasından razı olsun - DEYƏRDİ: **“AXŞAMA ÇIXDIĞIN ZAMAN SƏHƏRİN GƏLMƏSİNİ GÖZLƏMƏ. SƏHƏRƏ ÇIXDIĞIN ZAMAN İSƏ AXŞAMIN GƏLMƏSİNİ GÖZLƏMƏ. SAĞLAMLIĞINDA XƏSTƏLİYİN ÜÇÜN TƏDARÜK GÖR, HƏYATINDA İSƏ ÖLÜMÜN ÜÇÜN TƏDARÜK GÖR.”**[41]

## 📜 41-Cİ HƏDİS.

🕮 ABDULLAH İBN AMR İBN ASDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“SİZDƏN HƏR HANSI BİRİNİZİN İSTƏYİ MƏNİM**

---

[40] Sunən ibn Məcə,2045.
[41] Səhih əl-Buxari, 6416.

**GƏTİRDİYİMƏ TABE OLMADIQCA İMAN GƏTİRMİŞ SAYILMAZ."[42]**

## 42-Cİ HƏDİS.

ƏNƏS İBN MƏLİKDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ, MƏN ALLAH RƏSULUNUN - ona Allahın salavatı və salamı olsun - BELƏ DEDİYİNİ EŞİTDİM: **"UCA ALLAH DEYİR: EY ADƏM OĞLU! SƏN MƏNƏ DUA EDİB MƏNDƏN İSTƏDİKCƏ (YALVARDIQCA) MƏN SƏNİN ETDİYİN GÜNAHLARA BAXMADAN SƏNİ BAĞIŞLAYARAM. EY ADƏM OĞLU! ƏGƏR SƏNİN GÜNAHLARIN SƏMAYA QƏDƏR ÇATSA, SONRA DA SƏN QAYIDIB MƏNDƏN BAĞIŞLANMA İSTƏSƏN, MƏN SƏNİ BAĞIŞLAYARAM. EY ADƏM OĞLU! ƏGƏR SƏN MƏNİM HÜZURUMA YER DOLUSU QƏDƏR GÜNAHLARLA GƏLSƏN, SONRA MƏNİMLƏ MƏNƏ HEÇ BİR ŞEYİ ŞƏRİK QOŞMADAN QARŞILAŞSAN, MƏN DƏ SƏNƏ YER DOLUSU QƏDƏR MƏĞFİRƏTLƏ GƏLƏRƏM (SƏNİ BAĞIŞLAYARAM)."[43]**

## 43-CÜ HƏDİS.

ABDULLAH İBN ABBASDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona

[42] Mişkətul-Məsabih, 1/59.
[43] Sunən ət-Tirmizi, 3540.

Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“MİRAS PAYLARINI SAHİBLƏRİNƏ VERİN. YERDƏ QALANI İSƏ (ATA TƏRƏFDƏN) ƏN YAXIN OLAN KİŞİYƏ VERİLİR.”**[44]

## 📜 44-CÜ HƏDİS.

🕮 MÖMİNLƏRİN ANASI AİŞƏDƏN- Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“QAN QOHUMLUĞU SƏBƏBİ İLƏ HARAM OLANLAR SÜD QOHUMLUĞU SƏBƏBİ İLƏ DƏ HARAM OLUR.”**[45]

## 📜 45-Cİ HƏDİS.

🕮 CABİR İBN ABDULLAHDAN - Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun FƏTH İLİNDƏ MƏKKƏDƏ - DEMİŞDİR: **“HƏQİQƏTƏN DƏ, ALLAH VƏ ONUN RƏSULU ŞƏRABIN, ÖLMÜŞ HEYVANIN, DONUZ ƏTİNİN VƏ BÜTLƏRİN ALIŞ-VERİŞİNİ HARAM ETMİŞDİR.”**

📃 ONA DEDİLƏR Kİ: *EY ALLAHIN ELÇİSİ! ÖLMÜŞ HEYVANIN İÇ YAĞI HAQQINDA GÖRÜŞÜN NƏDİR? ÇÜNKİ ONUNLA GƏMİLƏR BOYANIR, DƏRİLƏR YAĞLANIR VƏ LAMPALARDA AYDINLATMA OLARAQ İSTİFADƏ OLUNUR.*

🕮 ALLAH RƏSULU DEDİ: **“XEYR, O HARAMDIR.”**

---

[44] Səhih əl-Buxari, Səhih Muslim.
[45] Səhih əl-Buxari, Səhih Muslim.

🕮 SONRA ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“ALLAH YƏHUDİLƏRƏ LƏNƏT ELƏSİN. HƏQİQƏTƏN DƏ, ALLAH ONLARA ÖLMÜŞ HEYVANIN İÇ YAĞINI HARAM ETDİ, ONLAR İSƏ ONU ƏRİTDİLƏR, SONRA ONU SATIB QAZANCINI YEDİLƏR.”**[46]

## 📜 46-CI HƏDİS.

🕮 ƏBU MUSA ƏL-ƏŞARİDƏN- Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ - DEYİR:*ALLAH RƏSULU* - *ona Allahın salavatı və salamı olsun* - *ONU YƏMƏNƏ GÖNDƏRDİ VƏ ONDAN YƏMƏNDƏ HAZIRLANAN İÇKİLƏR HAQQINDA SORUŞDU.*

🕮 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“O NƏDİR?”**

📜 ƏBU-MUSA DEDİ: *ƏL-BİTU VƏ ƏL-MİZRU.*

📜 ƏBU-BURDƏYƏ DEDİLƏR: *ƏL-BİTU NƏDİR?*

📜 ƏBU-BURDƏ DEDİ: *ƏL-BİTU BALDAN DÜZƏLDİLMİŞ ŞƏRABDIR.*

📜 ƏBU-BURDƏYƏ DEDİLƏR: *ƏL-MİZRU NƏDİR?*

📜 ƏBU-BURDƏ DEDİ: *ƏL-MİZRU ARPADAN DÜZƏLDİLMİŞ ŞƏRABDIR.*

---

[46] Səhih əl-Buxari, Səhih Muslim.

🕮 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ: **“HƏR BİR SƏRXOŞEDİCİ İÇKİ HARAMDIR.”**[47]

## 📜 47-Cİ HƏDİS.

🕮 MİQDAM İBN MƏDİ KƏRİBDƏN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“ADƏM ÖVLADI MƏDƏSİNDƏN DAHA ZİYANLI BİR QAB DOLDURMAMIŞDIR. HALBUKİ İNSANA ONU AYAQDA TUTMASI ÜÇÜN BİR NEÇƏ LOXMA YEMƏSİ KİFAYƏTDİR. ƏGƏR ÇOX YEYƏCƏKSƏ, ONDA MƏDƏSİNİN ÜÇDƏ BİRİNİ YEMƏYƏ, ÜÇDƏ BİRİNİ SUYA, ÜÇDƏ BİRİNİ İSƏ NƏFƏS ALMAĞA AYIRSIN.”**[48]

## 📜 48-Cİ HƏDİS.

🕮 ABDULLAH İBN AMRDAN- Allah ondan və atasından razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **“DÖRD XÜSUSİYYƏT VARDIR Kİ, BUNLAR KİMDƏ OLARSA, O, ƏSL MÜNAFİQDİR. ƏGƏR ONDA BU XÜSUSİYYƏTLƏRDƏN BİRİ OLARSA, TƏRK EDƏNƏ QƏDƏR O ADAMDA NİFAQDAN BİR XÜSUSİYYƏT OLAR.»**

**1. DANIŞAN ZAMAN YALAN DANIŞAR.**

---

[47] Səhih əl-Buxari.
[48] Sunən ət-Tirmizi, 47.

**2. VƏD VERƏN ZAMAN VƏDİNƏ XİLAF ÇIXAR.**
**3. MÜNAQİŞƏ EDƏN ZAMAN HƏDDİ AŞIB ƏDƏBSİZLİK EDƏR.**
**4. SÖZ VERƏN ZAMAN SÖZÜNDƏ DURUB SÖZÜNÜ TUTMAZ."**[49]

## 📜 49-CU HƏDİS.

🕮 ÖMƏR İBN ƏL-XATTABDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEMİŞDİR: **"ƏGƏR SİZ ALLAHA HAQQI İLƏ TƏVƏKKÜL ETSƏYDİNİZ, QUŞLARIN RUZİLƏNDİYİ KİMİ SİZ DƏ RUZİLƏNƏRDİNİZ. ONLAR SƏHƏR YUVALARINDAN ACQARINA ÇIXIRLAR, AXŞAM İSƏ TOX QARINA QAYIDIRLAR."**[50]

## 📜 50-Cİ HƏDİS.

📋 ABDULLAH İBN BUSRDAN - Allah ondan razı olsun - RƏVAYƏT OLUNAN HƏDİSDƏ DEYİR: BİR KİŞİ PEYĞƏMBƏRƏ - ona Allahın salavatı və salamı olsun - GƏLİB DEDİ: *EY ALLAHIN RƏSULU! İSLAMIN ƏMRLƏRİ MƏNİM ÜZƏRİMƏ AĞIR GƏLDİ VƏ MƏN ETMƏKDƏN ACİZ QALDIM. MƏNƏ ƏZMLƏ DAVAM EDƏCƏYİM BİR ƏMƏL HAQQINDA XƏBƏR VER.*

---
[49] Səhih əl-Buxari, Səhih Muslim.
[50] Sunən ət-Tirmizi, 33.

🕮 ALLAH RƏSULU - ona Allahın salavatı və salamı olsun - DEDİ:
**“DİLİN ALLAHI ZİKR ETMƏKLƏ NƏM QALSIN.”**[51]

*ALLAHA HƏMD OLSUN, TAMAMLANDI*

*MƏHƏRRƏMM AYININ 10-U 1445-Cİ İL.*

*ARİF ALLAHYAROV*

[51] Sunən ət-Tirmizi, 3375.